Azərbaycan Aqrar Elmi 4 2018 Аграрная Наука Азербайджана

UOT 619:614.31

# BOĞAZ İNƏKLƏRİN SAXLANMA VƏ YEMLƏNDİRİLMƏSİNİN SANİTAR-GİGENİK QİYMƏTLƏNDİRİLMƏSİ

**Ə.MƏMMƏDLİ, Y.BAĞIROV, R.MƏMMƏDOV, S.MƏMMƏDOVA**
**AKTN Baytarlıq Elmi Tədqiqat İnstitutu**

*Məlum olduğu kimi boğazlıq fizioloji bir proses olub, heyvanların mayalandığı vaxtdan doğan günə qədər olan dövrü əhatə edir. Heyvandarlığın uğurlu inkişafi boğaz heyvanlara baytarlıq-sanitariya və gigiyena qaydalarına və fizoloji tələbatına uyğun olaraq qulluq edilməsindən asılıdır. Odur ki, heyvanların boğazlıq dövründə düzgün balanslaşdırılmış yemləmə, optimal saxlanma şəraitini və sağlamlığının qorunmasının çox böyük əhəmiyyəti vardır. Məqalədə kəndli-fermer təsərrüfatlarında boğaz heyvanların saxlanma və yeməndirmə şəraitinin sanitariya- gigiyena cəhətdən qiymətləndirilməsi həyata keçirilmişdir. Eyni zamanda yem rasionuna daxil olan yemlərin tərkibində karotin, fosfor və kalsium elementləri müəyyən edilərək araşdırılmışdır.*

***Açar sözlər:*** *boğaz inək, qısırlıq, çətin doğum, massion(fəal gəzinti), profilaktika*

Qeyd etmək lazımdır ki, heyvandarlığın uğurla inkişaf etdirilməsində, məhsuldarlığın kəmiyyət və keyfiyyətinin yüksəlməsində, baytarlıq-sanitariya və gigiyena tədbirlərinin davamlı və düzgün həyata keçirilməsinin çox praktik əhəmiyyəti vardır. Bu tədbirlərin tələb və şərtləri heyvandarlıqda çox geniş tətbiq olunmalıdır. Belə ki, heyvanların saxlanması, yemləndirilməsi, tövlələrdə optimal mikroiqlimin yaradılması, təmizlik işlərinin vaxtında aparılması, peyinin vaxtında yığılıb, biotermiki zərərsizləşdirilməsi, cavanların yetişdirilməsi və bəslənməsi, eləcə də digər məsələlər sanitar – gigyenik tələblərə uyğun olaraq yerinə yetirilməlidir.

Respubilkada heyvandarlığın intensiv və məhsuldar inkişaf etdirilməsi üçün boğaz heyvanların saxlanma və yemləndirilməsinin sanitar-gigiyenik qiymətləndirilməsi və müalicə profilaktika tədbirlərinin həyata keçirilməsi çox vacib və təxirəsalınmaz məsələlərdən başlıcasıdır. Bu baxımdan boğaz inəklərin saxlanmasının və yemləndirilməsinin sanitariya-gigiyena cəhətdən qiymətləndirib, lazımı yaxşılaşdırıcı tədbirlərin hazırlanması ilə bağlı tədqiqar-təsərrüfat işlərinin həyata keçirilməsi qarşıya qoyulmuşdur.

**Material və metodlar.**

Tədqiqatlar və təcrübələr BETİ-nin “Yoluxmayan xəstəliklər və baytarlıq sanitariya” şöbəsində, respublikanın heyvandarlıq “Aqrokomplekslərində” və fermer təsərrüfatlarında həyata keçirilmişdir. Mövsümlə əlaqədar olaraq ayrı-ayrı fermalarda boğaz heyvanların yem rasionuna daxil olan yemlərin tərkibi karotin, fosfor və kalsiuma görə müayinə edilmişdir. Eyni zamanda laktasiyanın sonunda süd və doğumdan sonra ağız süd nümunələri götürülmüş və onlar karotinə görə müayinədən keçirilmişdir.

Təcrübələr aparılan kəndli-fermer təsərrüfatlarında boğaz inəklər doğuşun sonuna qədər nəzarət altında saxlanmışdır. Boğaz heyvanların üzərində klinik müayinələr aparılmışdır.

Boğaz heyvanların saxlandığı tövlələrin sanitar-gigiyenik vəziyyəti araşdırılmışdır. Bu məqsədlə məlum gigiyeniki metodlardan istifadə edilmişdir. “Kənd təsərrüfatı heyvanlarının xüsusi gigiyenası”-( Ə.Əsgərov,1972),”İri buynuzlu heyvanların gigiyenası”-(G.Bolkov,1987),”Kənd təsərrüfatı heyvanlarının yemləndirilməsi”-(B.Bakanov, B.Menkin, 1989). Eyni zamanda doğumdan sonra baş verə biləcək xəstəliklərin də proqnozlaşdırılması həyata keçirilmişdir.

**Alınan nəticələr və onların təhlili.**

Qarşıya qoyulan məsələlərin həlli ilə əlaqədar olaraq, respublikanın müxtəlif coğrafi-iqlim zonalarında yerləşən heyvandarlıq fermer təsərrüfatlarında tədqiqat işləri və təcrübələr aparılmışdır. Bu məqsədlə Abşeron, Qusar, Xaçmaz, Masallı, Şamaxı, Ağsu, İsmayıllı və Şəki rayonlarının heyvandarlıq fermer təsərrüfatlarında 4632 baş iri buynuzlu heyvanlar, o cümlədən 1840 baş boğaz inək üzərində ümumi baytarlıq baxışı (müayinəsi) həyata keçirilmişdir. Eyni zamanda həmin heyvanların saxlandığı tövlələrin sanitariya-gigiyena vəziyyəti eləcə də boğaz heyvanların yemləndirilməsi araşdırılaraq təhlil edilmişdir.

Bütün müşahidə təcrübələrin nəticələri göstərilmişdir ki, “Aqrokompleks” heyvandarlıq təsərrüfatları istisna olmaqla, yerdə qalan kəndli-fermer təsərrüfatlarında boğaz heyvanların saxlanması və yemləndirilməsi qənaətbəxş deyildir. Belə ki, ilk növbədə boğaz heyvanlar ayrıca saxlanmır, onlar üçün xüsusi yem rasionu tutulmur, bu heyvanlar ümumi naxırda saxlanılır, boğaz inək və düyələrin uçotu aparılmır, boğaz heyvanların

doğuma 2 ay qalmış sağımı dayandırılmır, doğum şöbəsi və proflaktoriya yoxdur.

Fermalarda boğaz heyvanlara kifayət dərəcədə qulluq edilmir. Onların dəri örtüyü, yelini və xarici tənasül orqanları çikli olmaqla, vaxtaşırı yuyulub təmizlənmir.

Tövlələrin daxili, həyətyanı sahələr antisanitariya vəziyyətində olmaqla, peyin vaxtında yığılıb biotermiki zərərsizləşdirilmir. Heyvandarlıq binalarının girəcək və çıxacaqlarında dezobariyerlər yoxdur. Tövlələrin daxili havası, döşəmə, tavan və pəncərələri sanitar-gigiyenik tələblərə cavab vermir. Tövlələrin ventilyasiya sistemi yoxdur, təbii havalandırmadan istifadə edilir.

Bir məsələni xüsusi vurğulamaq lazımdır ki, heyvanlara verlən yemlərin bioloji dəyəri və sanitariya keyfiyyəti yoxlanılmır.

Yemlərin tərkibində karotin, kalsium, fosfor göstəricilərinə görə yoxlamaq məqsədi ilə 38 ədəd müxtəlif fermer təsərrüfatlarından gətirilmiş yem nümunələri müayinədən keçirilmişdir. Alınmış nəticələr aşağıdakı cədvəldə verilir.

**Cədvəl 1**

**Müxtəlif kəndli-fermer təsərrüfatlarından gətirilmiş yemlərin tərkibində karotin, fosfor və kalsiumun təyini**

| Təsərrüfatların adları və yem nümunələri | **Karotin mq%** | **Fosfor mq%** | **Kalsium mq%** |
|---|---|---|---|
| **Abşeron Məhəmmədli kft.** Yonca otu | 0,68 | 4,12 | 2,85 |
| Yem çuğunduru | 0,42 | 2,8 | 3,12 |
| Quru çəmən otu | 0,14 | 4,1 | 3,7 |
| Kəpək | 3,5 | 1,2 | 2,1 |
| Pambıq çiyidi | 0,03 | 0,9 | 1,8 |
| Qarışıq yem | 2,3 | 3,4 | 3,6 |
| **Masallı r. Ərkivan kft.** Quru yonca otu | 0,04 | 3,5 | 6,3 |
| Qarışıq yem | 0,03 | 5,1 | 7,2 |
| Kəpək | 2,2 | 0,9 | 2,2 |
| Vələmir | 0,30 | 5,2 | 3,4 |
| Qarğıdalı | 0,02 | 3,8 | 4,2 |
| Pambıq çiyidi | 0,01 | 4,1 | 4,0 |
| **Qusar r. Şahdağ kft.** Qarışıq yem | 0,32 | 5,2 | 4,8 |
| Quru yonca otu | 0,84 | 4,8 | 6,5 |
| Silos | 0,08 | 5,6 | 5,4 |
| Senaj | 0,06 | 4,4 | 6,2 |
| Kəpək | 0,02 | 5,3 | 6,7 |
| Pambıq çiyidi | 0,02 | 6,1 | 3,92 |
| Quru çəmən otu | 0,18 | 3,9 | 3,56 |
| **Norma** | 0,5-3,0 | 4,5-6,0 | 10,0-12,5 |

Cədvəldə göstərilən rəqəmlərin təhlili göstərir ki, bütün kəndli-fermer təsərrüfatlarında yemlərin tərkibində olan karotin, fosfor və kalsiumun miqdarı normadan çox aşağıdır. Hətta bəzi təsərrüfatların yem nümunələrində karotinin izi belə tapılmamışdır. Belə vəziyyətin olması onu göstərir ki, bu rayonların yerləşdiyi coğrafi- təbii iqlim zonalarının bitki örtüyünün tərkibində qeyd olunan göstəricilər kifayyət dərəcədə yoxdur. Beləliklə, boğaz heyvanlara verilən yemlərin keyfiyyətsiz olması müşahidə olunur.

Odur ki, belə keyfiyyətsiz yemlərlə boğaz heyvanların yemləndirilməsi boğazlığın gedişatına və doğulan balaların zəif və xəstəliklərə həssas olmasına səbəb olur. Boğaz inəklər südünü qurutmazdan əvvəl və doğumdan sonra gizli mastitə yoxlanılmalıdır. Lakin bu müayinə fermer təsərrüfatlarında aparılmır. Bu məqsədlə Abşeron rayonunun bir neçə təsərrüfatlarında süd nümunələri götürülmüş və gizli mastitə görə müayinə edilmişdir. Müayinələrin nəticələri cədvəl 2-də verilir.

**Abşeron rayonu**

**Cədvəl 2**

| Təsərrüfatların adı və süd nümunələri | Diaqnostikumlar | | | | Nəticə |
|---|---|---|---|---|---|
| | LD | SD | Mastidin | Dimastin | |
| **“Fatmai” kft** FSN-1 | + + + | + + | + + + | + + + | + |
| FSN-2 | – | – | – | – | – |
| FSN-3 | + + + | + + + | + + | + + + | + |
| FSN-4 | – | – | – | – | – |
| FSN-5 | + + | + + | + + | + + + | + |
| | | | | | |
| “Mehdiabad” kft MSN-1 | – | – | – | – | – |
| MSN-2 | + + + | + + | + + + | + + + | + |
| MSN-3 | – | – | – | – | – |
| MSN-4 | + + + | + + | + + | + + + | + |
| MSN-5 | + | + | + | + | ± |
| “Cavid”-MMC CSN-1 | – | – | – | – | – |
| CSN-2 | – | – | – | – | – |
| CSN-3 | + + + | + + | + + + | + + | + |
| CSN-4 | – | – | – | – | – |
| CSN-5 | + + + | + + | + + + | + + + | + |

Cədvəldən göründüyü kimi, Abşeron rayonunun 3 kəndli-fermer təsərrüfatından gətirilmiş 15 süd nümunəsindən 6-sında ( FSN-1, FSN-3, FSN-5, MSN-2, MSN-4, CSN-3 və CSN-5 ) müsbət və birində isə şübhəli reaksiya alınmışdır. Müsbət və şübhəli reaksiya verən süd nümunələri bakteoroloji olaraq da müayinə olunmuşdur. Şübhəli reaksiya verən süd nümunəsi mənfi və müsbət reaksiya verən süd nümunələri isə bakteoroloji olaraq təsdiq edilmişdir. Beləliklə, 6 baş inək gizli mastitə tutulmuşdur. Həmin xəstə inəklərin müalicəsi şöbənin hazırlanmış və təsdiq edilmiş “müalicə sxemi” əsasinda həyata keçirmişdir.

Heyvandarlığın daha da məhsuldar olması və intensiv inkişaf etdirilməsi, boğaz heyvanlara zootexniki qaydada baxılmasından, baytarlıq-sanitariya və profilaktika tədbirlərinin vaxtlı-vaxtında və keyfiyyətli tətbiq olunmasından asılıdır.

Bütün yuxarıda qeyd olunanları, tədqiqat və müşahidələri təhlil edərək aşağıdakı nəticələrə gəlmək olar.

**Nəticələr**

1. Müəyyən edilmişdir ki, tədqiqat və müşahidə apardığımız he7yvandarlıq "Aqrokomplekslәri" istisna olmaqla, özəl kəndli-fermer təsərrüfatlarında boğaz heyvanların saxlanma və yemlənmə şəraiti qənaətbəxş deyildir.
2. Boğaz heyvanlar ayrı saxlanılmır, xüsusi yem rasionu tutulmur və yemlərin keyfiyyəti yoxlanılmır.
3. Baytarlıq-sanitariya-gigiyena qaydalarına uyğun olaraq, boğaz heyvanlar doğuma hazırlanmırlar.

**ƏDƏBIYYAT**

1.Онегов А.П., Храбустовский, Черных В.Н. «Гигиена сельскохозяйственных животных», Москва,1972, 432 стр. 2.Rzayev Ç., Seidov M. "Baytarlıq mamalığı və kənd təsərrüfatı heyvanlarının süni mayalandırılması", Bakı, 1975, 212 səh. 3.Əsgərov Ə.A. " Kənd təsərrüfatı heyvanlarının ümumi gigiyenası" Bakı, 1981, 296 səh. 4.Волков Г.К. « Гигиена крупного скота на промышвенных фермах», Москва, 1987, 317 стр. 5.Баканов В.Н., В.К. Менькин, Кормление сельскохозяйственных животных», Москва, 1989, 512 стр. 6. Əliağayev Ə.A., Şirinov N.M. " Sanitariya mikrobiologiyası" , Bakı-1992, 257 səh.

**Санитарно-гигиенические оценки содержания и кормления стельных коров.**

**А.Т. Мамедли, Ю.Т.Багиров, Р.Д.Мамедов, С.Дж.Мамедова**

В статье приводятся результаты наблюдении и исследований проводимых на животноводческих хозяйствах в республике. Также про анализированы полученных данных. Кроме этого в статье изложены исследования по определению каротина, кальцием и фосфора кормов входящих в состав рациона стельных коров.

***Ключевые слова:*** *стельная корова, кормовой рацион, бесплодья, сухостойный период, моцион.*

**Sanitary and hygienic assessment of the content and feeding of the cows**

**A.T.Mammadli, Y.T.Bagirov, R.D.Mammadov, S.D.Mammadova**

The article presents the results of observation and research conducted on livestock farms in the republic. The obtained data are also analyzed. In addition, the article presents the research on the determination of carotene, calcium and phosphorus in the feed of the cows that make up the diet.

***Key words:*** *sterile cow, fodder diet, infertility, dry period, exercise.*